Academic Journal of History and Idea Академическая История и Мысль




Akademik Tarih ve Düşünce Dergisi

ISSN: 2148-2292




*Araştırma Makalesi* https://doi.org/10.46868/atdd.71 ***Original Article***

# Qarabağın Alban-Qıpçaq tarixinə dair

**Ramin Əlizadə*** **Elnur Nəciyev****

**ORCID: 0000-0002-0146-8946** **ORCID: 0000-0003-3989-6257**

**Xülasə**

Məqalədə Qarabağın Alban-Qıpçaq tarixinə qısaca nəzər salınır. Məlum olduğu kimi Qarabağ Azərbaycanın ayrılmaz tərkib hissəsi və qədim türk yurdudur. Bu yurdun tarixində orta əsrlərdə ən fəal türk tayfalarından olan qıpçaqlar dərin iz buraxıblar. Bu izlərə istər bölgədə qorunub saxlanılan tarixi abidələrdə, istər tədqiq etdiyimiz dövrün tarixinə dair müxtəlif dilli mənbələrdə, istər yer-yurd adlarında, istərsə də xalqın yaddaşında rast gəlinir. Qarabağda bu gün qəsdən dolaşıq vəziyyətə salınan alban tarixi qıpçaq tayfalarının Azərbaycanın bu qədim torpağındakı tarixi ilə paralel şəkildə tədqiq olunarsa bütün suallara asanlıqla cavab tapmaq olar. Alban-Xaçın knyazlığının bugünkü Gürcüstan hüdudlarında tarixən yaşamış olan qıpçaqlarla qohumluq əlaqələri, Qarabağdakı alban kilsələrinin kitabələrində qorunub saxlanılan şəxs adları, Azərbaycan Səfəvilər dövləti dövründə otuzuikilər adlanan tayfa birliyinin tərkibindəki qıpçaq mənşəli 8 oymağı, alban məliklərinin 1723-cü ildə Rusiya imperatoru I Pyotra məktubunda öz əksini tapan alban türkü ifadəsi və başqa bu kimi faktların ümumi şəkildə tədqiq olunması Qarabağda alban-qıpçaq tarixinə şahidlik edir.

**Açar Sözlər:** Azərbaycan, Qarabağ, Qıpçaq, Alban, Türk.

**Gönderme Tarihi: 01/12/2020** **Kabul Tarihi:29/12/2020**

---

**Böyük elmi işçi, Azerbaycan Milli elimler Akademisi A.A.Bakıxanov adına Tarix İnstitutunun "Azərbaycanın qədim tarixi" şöbəsinin böyük elmi işçisi, raminalizadeh17@gmail.com*

***Elmi işçisi Azerbaycan Milli elimler Akademisi A.A.Bakıxanov adına Tarix İnstitutunun "Azərbaycan diasporu" şöbəsinin elmi işçisi, elnurneciyev@gmail.com*

***Bu makaleyi şu şekilde kaynak gösterebilirsiniz:***

ƏLIZADƏ, R. ve NƏCIYEV, E., ''Qarabağın Alban-Qıpçaq tarixinə dair'', *Akademik Tarih ve Düşünce Dergisi*, C. 7, S. 4., 2020, s. 2578-2593.

# To the Albanian-Kipchak History of Karabakh

**Ramin Əlizadə*** **Elnur Nəciyev****
**ORCID: 0000-0002-0146-8946** **ORCID: 0000-0003-3989-6257**

**Abstract**

The article briefly examines the Albanian-Kipchak history of Karabakh. As we know, Karabakh is an integral part of Azerbaijan and an ancient turkic land. The Kipchaks, one of the most active Turkic tribes in the Middle Ages, left a deep mark on the history of this region. These traces are found both in historical monuments preserved in the region, and in multilingual sources on the history of the period, which we are studying, both in the names of localities and in people's memory. If you study the Albanian history (which is deliberately confused today in Karabakh) in parallel with the history of the Kipchak tribes in this ancient land of Azerbaijan, you can easily find answers to all questions. A general study of the kinship relations of the Albanian-Khachin Principality with the Kipchaks, who historically lived within the borders of modern Georgia, the names of persons preserved in the inscriptions of Albanian churches in Karabakh, 8 tribes of Kipchak origin as part of the tribal union called "Otuzikiler" during the Azerbaijani Safavid state, the expression Albanian Turks, reflected in the letter of the Albanian melikdoms to the Russian Emperor Peter I in 1723, and other similar facts testify to the Albanian-Kipchak history in Karabakh.

**Keywords**: Azerbaijan, Karabakh, Albanian, Kipchak, Turk.

**Received Date: 01/12/2020** **Accepted Date: 29/12/2020**

**Asst.Professor, Azerbaijan National Academy of Sciences, A.A. Institute of history named after bakıxanov, raminalizadeh17@gmail.com*
** Research assistant, Azerbaijan National Academy of Sciences, A.A. Institute of history named after bakıxanov, elnurneciyev@gmail.com*
***You can refer to this article as follows:***
ƏLIZADƏ, R. ve NƏCIYEV, E., ‘’ To the Albanian-Kipchak History of Karabakh ’’, *Academic Journal of History and Idea,* C. 7, S. 4., 2020, p. 2578-2593.

# К Албано-Кыпчакской историю Карабаха

**Резюме**

В статье кратко рассматривается Албано-кыпчакская история Карабаха. Как известно, Карабах является неотъемлемой частью Азербайджана и древней тюркской землёй. В истории этого края кипчаки, одно из самых активных тюркских племен в средние века, оставили глубокий след. Эти следы встречаются как в исторических памятниках, сохранившихся в регионе, так и в разноязычных источниках по истории исследуемого нами периода, как в названиях местностей, так и в народной памяти. Если изучать албанскую историю (который намеренно запутан сегодня в Карабахе) параллельно с историей кыпчакских племен на этой древней земле Азербайджана на все вопросы можно легко найти ответы. Общая изучения родственных связей Албано-Хачинского княжества кыпчаками, которые исторически проживали в границах современной Грузии, имена лиц, сохранившиеся в надписах албанских церквей в Карабахе, 8 племён кыпчакского происхождения в составе племенного союза, называемого «Отузикиляр» в период Азербайджанского государство Сефевидов, выражение албанские тюрки, отраженное в письме албанских меликств к российскому императору Петру I в 1723 году, и других подобных фактов свидетельствует об Албано-кыпчакской истории в Карабахе.

**Ключевые слова:** Азербайджан, Карабах, Албан, Кыпчак, Тюрк.

**Получено: 01/12/2020** **Принято: 29/12/2020**

## Giriş

Qıpçaq türkləri Azərbaycanın tarixində dərin izlər qoymuş ən fəal türk tayfalarından biridir. Azərbaycan xalqının təşəkkülü prosesində müəyyən qədər onlar da iştirak etmişlər. Qıpçaq türklərinin izlərinə nəinki Azərbaycan xalqının milli-mənəvi sərvəti olan "Kitabi-Dədə Qorqud" dastanlarında, tarixi Azərbaycan torpaqlarının yer-yurd adlarında, yazılı mənbələrdə, hətta Qarabağdakı alban kilsələrinin kitabələrində rast gəlinir. Xüsusilə, Qarabağdakı alban kilsələrinin sahibləri hətta 1723-cü ilin martında Rusiya imperatoru I Pyotra məktublarında belə özünü fərqləndirmək üçün islamı qəbul edənləri alban türkü, qəbul etməyənləri xristian albanlar adlandırmaqla[1] əslində türk kökünə bağlılığını bir daha təsdiq etmişdilər. Lakin xristianlığı qəbul edən albanların zamanla qriqoryanlaşması və nəhayət 1836-cı ilin 11 martında Alban kilsəsinin ləğvi albanların türk-qıpçaq yaddaşının silinməsi prosesini daha da sürətləndirmişdir. 10 fevral 1828-ci il Türkmənçay, 14 sentyabr 1829-cu il Ədirnə müqaviləsinin imzalanması ilə ermənilərin kütləvi şəkildə Azərbaycan torpaqlarında məskunlaşdırılması, 21 mart 1828-ci ildə Erməni vilayətinin yaradılması belə bu həqiqəti dəyişə bilmədi. Xüsusilə Azərbaycanın tarixi ərazisi olan Qarabağda Ermənilər tərəfindən dəfələrlə saxtalaşdırılmaya məruz qalan xristian irsimizə aid alban kilsələri bu həqiqəti özündə yaşadaraq bugünlərə qədər gətirib çıxartdı.

## Azərbaycan tarixində qıpçaqlar

Azərbaycan ən qədim zamanlardan başlayaraq, bütün tarixi dövrlərdə ümumtürk məkanın mühüm tərkib hissəsi – qədim oğuz yurdu, Azərbaycan xalqı isə bu diyarın ən qədim yerli (aborigen) əhalisi olmuşdur. Böyük Azərbaycan hökmdarı, məşhur oğuz-türk sərkərdəsi Ağqoyunlu Həsən Sahibqıranın (1453-1478) tapşırığı ilə yazılmış Əbu Bəkr əl-Tehrani əl-İsfahaninin "Kitabi Diyarbəkriyyə" əsərindən də məlum olur ki, Azərbaycan ən qədim oğuz-türk məskənlərindən biridir. Qədim oğuzlar, o cümlədən Oğuz xaqanın özü, xanlar xanı Bayandur xaqan, həmçinin sonrakı dövrlərin məşhur oğuz-türk sərkərdələri, hətta Qıpçaq xanın özü də Azərbaycanda yaşamış və burada dəfn olunmuşlar. [2] Əsərdə "Qarabağ Bayandur xanın qışlağı, Göyçə dənizi yaylağı"[3], Göyçə

---

[1] *Arxiv Vneşney Politiki Rossiyskoy İmperii (AVPRİ), f. 100, 1723 g., d.1, l. 2.*
[2] Yaqub Mahmudov, "Dədə Qorqud kitabı" - xalqın yaratdığı və yaşatdığı tarix*", Dədə Qorqud dünyası: məqalələr*, Öndər nəşriyyat, Bakı 2004, s. 18.

dəniz tərəfdə Oğuz xaqanın dəfn edilməsi [4], Qıpçaq xanın Ağqoyunlu Həsən Sahibqıranın nəsil şəcərəsində 16-cı şəxs[5] olması kimi maraqlı faktlar qeyd olunub.

Bütövlükdə, mənbələrə əsaslanmaqla Cənubi Qafqazda türk tayfalarının, o cümlədən də qıpçaqların tarixi və yaşadığı areala kifayət qədər aydınlıq gətirmək mümkündür. Belə ki, e.ə. I əsr – b.e. II əsrlərdə qədim türk tayfalarından olan hunların adı heniox və ya unn, sabirlərin adı isə savir şəklində Strabon, Böyük Plini və Dionisi Periyegetin əsərlərində çəkilmişdir.[6] Erkən orta əsrlərdə Dağıstan ərazisi bütövlükdə Hunistan adı ilə tanınırdı. Suriya salnaməçisi Mitilenli Zaxariyanın verdiyi məlumata görə, V əsrin 30-80-ci illərində Alban dövlətinin şimal bölgələrində sabir, avğar, burğar, kurtarğar, xasar, dirmar, sirurğur, bağarsik, kulas və abdal türk tayfaları yaşayırdılar.[7] Hunistan VII əsrin əvvəllərindən etibarən yeni yaranmış Xəzər xaqanlığının mərkəzi bölgəsinə çevrildi. Xəzər xaqanlığının dağılmasından sonra isə qıpçaq (kuman) boylarının, əsasən də kimeklərin sıx məskunlaşdığı bu ərazi Kas-kimek adlanmağa başladı. Kas-kimek sözü qədim türkcədə "kas/kad" yəni "dağ", "kimek" isə qıpçaqların adıdır. Kas-kimeklər "dağ qıpçaqları" deməkdir. Qeyd edək ki, hazırda Azərbaycan Respublikasının şimal bölgələrindən müasir Dağıstan ərazisi də daxil olmaqla geniş coğrafiyada yaşayan müxtəlif xalqların nümayəndələri ümumi ad olan "dağlılar" adı ilə tanınırlar. Qıpçaqlar bəzən kuman adı ilə də tanınırdılar.[8] Kuman çökəkliyinin adı bu günədək Kuma-Manıç şəklində gəlib çatmışdır. Müasir kumıklar kimeklərin törəmələridir. Qazıqumux toponimi isə Kas-kimek adından qaynaqlanır. Məlum olduğu kimi Xəzər xaqanlığının əhalisi Oğuz və Qıpçaq boylarından ibarət idi. Xəzər xaqanlığı dağılandan sonra əsasən yaylaq və qışlaq maldarlığı ilə məşğul olan türk boyları cənub bölgələrində də əvvəlki dövrlərdə olduğu kimi başlıca etnik substrata çevrildilər. Qıpçaq toponimikası Azərbaycanın demək olar ki, qərb və şimal-qərb bölgələrində daha geniş yayılmışdır: Göyçə ətrafında Qıpçaq qalası, Qaxda Qıpçaq təpəsi, Zaqatalada Qıpçaq çayı və s. Qərbi Azərbaycan və Qarabağ ərazilərindəki xristian məbədlərində xaç relyefləri, əsasən Kuman-Qıpçaq xaç daşları kimi bir çox hallarda atlı döyüşçü və elat geyimləri ilə, iri ölçüdə təsvir olunmuşdur. Linqvistik araşdırmalar da, qədim Kuman-

---

[3] Əbu Bəkr əl-Tehrani, *Kitabi–Diyarbəkriyyə*, (fars dilindən tərcümə edən, ön söz və şərhlərin müəllifi R.Şükürova), Elm nəşriyyatı, Bakı 1998, s. 46.
[4] Ə. Tehrani, *a.g.e.*, s. 47.
[5] Ə. Tehrani, *a.g.e.*, s. 42.
[6] George Henrix Ursin, *Dionysius Periegetes. Οικουμένης περιήγησης – Dionysii Orbis Terrae Descriptio*, Typis Joh. Georgii Hofmanni, Ratispon 1705, s. 181.
[7] "Xronika Zaxariyii Ritora (Mitilenskogo)" (per. N. Pigulevskoy) Siriyskiye istoçniki po istoriyii narodov SSSR. M.; L. 1941, s. 165.
[8] Vasari Istvan, *Cumans and Tatars: Oriental Military in the Pre-Ottoman Balkans, 1185–1365*, Cambridge University Press, Cambridge 2005, s. XII-XIV

Qıpçaq dilinin digər müasir türk dillərinə nisbətən Azərbaycan türkcəsinə daha yaxın olduğunu ortaya qoyur. DNA analizləri Kuman-Qıpçaq türklərinin Avrasiya bozqırlarında – Mərkəzi Asiyadan, Qafqazdan Şərqi Avropaya, Macarıstana qədər geniş coğrafiyada yayıldığını təsdiqləyir. Qədim zamanlarda iskit, sak və ya hun adlandırılan bu qədim xalq Bizans və Qərbi Avropa qaynaqlarında kuman (=koman), ərəb və fars dilli mənbələrdə qıpçaq, gürcü mənbələrində kivcak, Çin qaynaqlarında kibça (kin ça), slavyan qaynaqlarında poloves, alman mənbələrində isə valben adı ilə tanınmışdır. Maraqlıdır ki, ermənilər bu türk boyunu xristian olduqları üçün arçi (arçu), hartes, harteş (xartes, Azərbaycan türkcəsində qardaş) adlandırmışlar. Ermənilərin bu cür adlandırmanı Qıpçaq türkcəsindən əxz edərək, qıpçaqları "qardaş", digər türkləri isə "tork" adlandırıb düşmənçilik etmələri, onların məkrli planlarının uzun illər davam etdiyini sübut edir. Ermənistanda Şirak vilayətinin Artik rayonunda Ariç, əvvəllər xpçax, qıpçaq adlanan kənd var idi. Bu kənddə mövcud Ariçavəng, əvvəllər Xpçaxavəng idi. Qərbi Azərbaycan ərazisində yerləşən Alban-Qıpçaq abidələrinin qriqoryanlaşdırılması da məhz erməni hiyləsinin faciəli nəticələrindən biri olmuşdur. Qıpçaqların qriqoriyanlaşdırılması XVI-XVII əsrlərdə başlamışdır.[9]

Qıpçaqlarla bağlı bir başqa maraqlı məqam 1267-ci ildən etibarən Gürcü dilində Soatabego adlanan, Bayburt, İspir, Tortum, Livana (Yusuf ilə Artvin), Oltu və Ardanuç ilə Şavşat kimi bütün Yuxarı və Orta Çoruk ərazilərini, Kür boyunca Gölə, Ərdahan, Axıska, Axalkələk və Azqur ərazilərini əhatə edən Atabəy yurdunun varlığı idi. Bu yurdda Qıpçaqlı Ortadoks/Kuman türklərinin "Atabəylər" sülaləsi yarımmüstəqil olaraq hökm sürürdü.[10] Bu yurdun yaranışında Gürcü çariçası Tamarın (1184-1213) da müəyyən qədər rolu var. Belə ki, o, Zaxareni gürcü ordusunun baş komandanı, onun qardaşı İvaneni isə atabəy təyin etmişdir. Tamar Azərbaycanın qərbində Borçalının cənubu və Loru mahalını "Somhet mtavarı" adı ilə Uzunqollu hərbi feodal nəslinə iqta olaraq vermişdir.[11] Gürcülər Somheti dedikdə qədim türk boylarının məskəni olan Meshetini və ondan da cənubda yerləşən Şərqi Anadolunun bir hissəsini nəzərdə tuturdular. Qeyd edək ki, coğrafi mənada gürcülər erməniləri "someh", yəni "cənublu",

---

[9] Aleksandr Qarkavets, *Konvergentsiya armyano-kıpçakskoqo yazıka k slavyanskim v XVI-XVII vv.*, Naukova dumka, Kiyev, 1979, s. 6.; Yaroslav Daşkeviç, "Armyano-kıpçakskiy yazık: etapı istorii", *Voprosı yazıkoznaniya*, №1, Nauka, Moskva 1983, s.96.
[10] Fahrettin Kırzıoğlu, *Osmanlıların Kafkas ellerini fethi (1451-1590)*, Türk Tarih Kurumu Yayınları, Ankara 1998, s. 85-86.
[11] M. Brosset, *a.g.e.*, s.364.

ermənilər isə gürcüləri "yuxarıda yaşayan" mənasını bildirən və "ver" sözünün cəm forması olan "virk" adlandırırlar. Nəticədə şimal sərhədləri müasir Gürcüstanın cənubundan başlayan Mesheti adı ilə tanınan Qıpçaq yurdunda Uzunqollular sülaləsinin başçılığı ilə Samshe (Cənub) Atabəyliyi, və ya bir başqa adı ilə Atabəy yurdu qurulmuşdur. Loru mahalında Axtala kəndində yerləşən Qıpçaq kilsəsi də o dövrdə inşa edilmiş Qıpçaq abidəsidir.[12] Bu Atabəy yurdu 1458-ci ildə Ağqoyunlu Həsən Sahibqıranın ilk Gürcüstan səfəri vaxtı Ağqoyunlu tabeliyini qəbul etmişdir.[13] Daha sonra Azərbaycan Səfəvilər dövlətinin tabeliyinə keçən Atabəy Qıpçaq yurdunun atabəyi, xalqın Böyük ləqəbi verdiyi Mirzə Çabuk 1512-ci ildə Osmanlı tabeliyini qəbul etmişdir.[14] Yalnız 1555-ci il Amasya sülhü ilə Atabəy Qıpçaq yurdunun Ərdahan, Ərdanuç, Oltu və Tortum əraziləri tam olaraq Osmanlıların nüfuz dairəsinə keçərək Ərzurum və Gürcüstan (Vilayet-i Erzennirum ve Gürcistan[15]) vilayətlərinin sancaqlarına daxil edildi. Maraqlıdır ki, Atabəy yurdu qeyd olunan vilayətlərin 20 sancağından biri kimi Döşqaya adlı ərazinin tərkibində qeyd edilir. Bu həmin Döşqayadır ki, Ağqoyunlu hakimiyyəti altında olarkən "Gürcüstan sərhəddi" (Atabəy yurdu) kimi Kitabi-Diyarbəkriyyədə xatırlanır.[16] Nəticə etibarilə Atabəy yurdu 1578-ci ildə yeni yaradılan Çıldır (Axıska) əyalətinə daxil edildi.[17] Qeyd edək ki, Atabəy yurdunu məskunlaşdıran qıpçaq türkləri Səfəvilər dövründə Gəncə-Qarabağ bəylərbəyiliyində də yaşayırdılar. Qızılbaş oymaqlarına daxil olan Otuzikili tayfası içərisində Əski-Kumanlı, Yeni-Kumanlı oymaqları da var idi.[18] Ə.Çingizoğlu Əski və Yeni-Kumanlıların Qaraağacda yaşamasını qeyd edir.[19] F. Kırzıoğlu icmal dəftərdə adı "Taife-i Ulusat-i Otuzikilü" kimi qeyd edilən bu tayfanın[20] 8 Kuman/Qıpçaq və 24 Qacar tayfasının birliyindən yarandığını qeyd edir.[21] Lakin o, 9 qıpçaq tayfasını qeyd edir. Fərq Sarıcalı oymağına görə yaranır ki, bu da həmin oymağın həm İyirmidördlərin, həm də Otuzikilərin tərkibində qeyd olunması ilə bağlıdır. Bu tayfalara Cancanlı (Arazbar nahiyəsində), Qəmərli (Gəncədə), Kəpənəkçi (Yevlaxda), Kırqallı (Ağcabədidə), Kobılu (Gəncədə), Əski Kumanlı və Yeni Kumanlı (Qarağacda), Padar (Keştasf nahiyəsində), Sarıcalı

---

[12] "Lori", *Soviet Armenian Encyclopedia (in Armenian)* 4, *Armenian Encyclopedia,* Yerevan 1978, pp. 663 – 664.
[13] F. Kırzıoğlu, *a.g.e.*, s. 37.
[14] F. Kırzıoğlu, *a.g.e.*, s. 88.
[15] F. Kırzıoğlu, *a.g.e.*, s. 244.
[16] Ə. Tehrani, *a.g.e.*, s. 79.
[17] F. Kırzıoğlu, *a.g.e.*, s. 291.
[18] *Gəncə-Qarabağ əyalətinin icmal dəftəri. [Tapu təhrir dəftəri - 699],* (Ön sözün müəl. Y.M.Mahmudov; tərt. T.H.Nəcəfli), Çaşıoğlu, Bakı 2010, s. 11.
[19] Ənvər Çingizoğlu, "Otuziki mahalı", *Soy elmi-kütləvi dərgi,* №9, Bakı, 2010, s.44-49.
[20] F. Kırzıoğlu, *a.g.e.*, s. 372.
[21] F. Kırzıoğlu, *a.g.e.*, s. 518.

(Xaçın nahiyəsində) oymaqları daxil idi.[22] F.Sümer Otuzikililəri Qarabağın tərəkəmə türkləri adlandırır.[23] Bu məlumatlar öz-özlüyündə Qarabağın türk yurdu olduğunu təsdiq edir. Əlavə olaraq qeyd edək ki, qıpçaq tayfası kimi də qeyd edilən Sarıcalı oymağının görkəmli nümayəndələri arasında Pənahəli xan Cavanşir də var.[24]

**Qarabağın alban-qıpçaq kilsələri**

Qarabağda qıpçaq izlərinə alban irsi olaraq günümüzə qədər gəlib çatan kilsələrdə də rast gəlmək mümkündür. Kəlbəcər rayonunda Xaçınçayın sol sahilində yerləşən Gəncəsər monastrı üzərindəki kitabədən də məlum olduğu kimi, Alban-Xaçın hökmdarı Həsən Cəlal və anası Hurişah Xatun (Xorişə) tərəfindən 1216-1238-ci illərdə inşa edilmişdir. Gəncəsər məbədinin kitabəsində belə bir məlumat da öz əksini tapıb: *"Müqəddəs Üçlüyün — Ata, Oğul və Müqəddəs ruhun adı ilə, mən, Tanrının xidmətçisi,* ***Həsən Dövlə, Vaxtanqın oğlu, Böyük Həsənin nəvəsi,*** *geniş əyalətləri ilə Xoxanaberdin çarı bu kitabəni yazmağı əmr etdim. Atam, ölümü və digər dünyaya köçməsindən əvvəl mənə və* ***böyük knyaz Sərkisin qızı*** *olan* ***anam Xorişəyə (Hurişaha - R.Ə., E.N.),*** *atalarımızın məzarı olan Gəncəsərdə bu kilsəni inşa etməyi vəsiyyət etdi ki, biz də inşaata erməni təqviminin 765-ci ilində (1216-cı ildə) Ruzi verənin köməkliyi ilə başladıq və şərq divarını pəncərəyə qədər inşa etdikdə dünyəvi həyatdan imtina edən anam üçüncü dəfə Yerusəlimə ziyarətə yola düşdü, orda rahibə köynəyi geyinərək illərlə Müqəddəs Qəbir kilsəsinin qapıları ağzında zahid həyatı sürərək vəfat etdi və orda da dəfn olundu. Biz isə həyatda qarşımıza çıxa biləcək bədbəxtlikləri yadda saxlayaraq inşaatı tamamlamağa çalışdıq və Rəhmli Rəbbin lütfü və xeyir-duası ilə onu 782-ci ildə (1238-ci ildə) tamamladıq".*[25] Monastır tikilib qurtarandan sonra Həsən Cəlal tikilinin üzərinə bu dini abidəni Alban xalqı üçün inşa etdirdiyini bəyan edən kitabə yazdırmışdır: *"Mən, Həsən Cəlal onu mənim Alban xalqım üçün inşa etdim".* Bu monastır kompleksi əksər Alban xristianlıq abidələri kimi daha qədim zamanlara aid tapınağın üzərində inşa edilmişdir.[26] Qeyd edək ki, albanlar da digər yerli türk boyları

---

[22] Fahrettin Kırzıoğlu, *Yukarı-Kür ve Çoruk boyları'nda Kıpçaklar: ilk-Kıpçaklar (M.Ö. VIII-M.S. VI. yy.) ve son-Kıpçaklar (1118, 1195) ile Ortodoks-Kıpçak atabekler hükûmeti (1267-1578) Ahıska Çıldır eyâleti tarihi'nden*, Türk Tarih Kurumu Yayınları, Ankara 1992, s. 137-138.
[23] Faruk Sümer, *Safevi devletinin kuruluşu ve gelişmesinde Anadolu türklerinin rolü*, Güven Matbaası, Ankara 1976, s. 198.
[24] Yaqub Mahmudov, Kərim Şükürov, *Qarabağ: Real tarix, faktlar, sənədlər,* Təhsil, Bakı 2013, s.25.
[25] Yepiskop Makar (Q. Barxudaryants), *Artsax,* Aror, Baku 1885, s. 111.
[26] İqrar Əliyev, Kamil Məmmədzadə, *Qarabağın Alban abidələri*, Azərbaycan dövlət nəşriyyatı, Bakı 1997, s.12.

kimi məbədə *tapınaq* deyirdilər.[27] Həsən Cəlalın atası Vaxtanq Girdiman qalası və kəndini Alban-Xaçın knyazlığına birləşdirmişdir.[28] Həsən Cəlalın hakimiyyəti dövrü "Alban intibahının son dövrü" idi. Onun Qəzvində monqollar tərəfindən öldürülməsi ilə bu dövr sona çatmışdır.[29] Alban tarixçisi Musa Kalankatlının "Alban tarixi" əsərinin davamı məhz bu dövrdə yazılmış, Gəncəli Kirakos özünün "Tarix" əsərini məhz bu dövrdə qələmə almışdır.

Alban-Xaçın knyazları soy-kök baxımından yaxın olan tanınmış Qıpçaq nəsillərindən qız alırdılar. Həsən Cəlalın atası Ərsak türklərinə, anası isə Qıpçaq türk nəsillərinə mənsub idilər. Hurişah Xatunun babası Qıpçaq əsilli Uzunqollular soyunun bəyi Vaqram (Zaxare), atası Akbuğa, qardaşları isə Vaqram, Zaxare və İvane idi.[30] Bu nəsil gürcü mənbələrində Mhargrdzeli adlanır ki, bu sözün gürcü dilindən tərcüməsi "uzun qol" deməkdir. 1913-cü ildə A.Şahnazaryan ermənicə yazdığı əsərində heç bir qaynağa istinad etmədən özünün uydurduğu konsepsiyaya görə Uzunqollular nəslinin Babilistandan gəldiyini qeyd etmişdir. A.Şahnazaryan yanlış olaraq bu sülaləni Zaxarın adı ilə Zaxaryan sülaləsi adlandırmışdır. Onun bu səhvini sonralar V. Minorski və V.E. Devid Allen də təkrar etmişlər.[31] Əslində onları çaşdıran bəzi gürcü mənbələrində Qıpçaq əsilli sərkərdələrin adlarının qarşısında bir çox hallarda Kurd (türkcədə Qurd) sözünün işlədilməsidir. Y.A.Manandyan A.Şahnazaryanın bu mülahizəsini qəti şəkildə rədd edərək həqiqətə uyğun olmadığını göstərmişdir.[32] V.Minorski "Qafqaz tarixi araşdırmaları" (Studies in Caucasian History) adlı əsərinin "Mhargrdzeli şahzadələri" adlı fəslində Gəncəli Kirakosun verdiyi məlumata istinadən bu nəslin "(xel) Babirakan" (?) tayfasına mənsub olduğunu, bu tayfanın isə Mesopotamiyada Mangur kürd federasiyasına daxil olan Piran boyundan olduğunu göstərir.[33] Gəncəli Kirakosun əsərinin tərcüməçilərindən biri olan L.A.Xanlaryan bu etnonimin mətndə ***բաբիրա կան խել*** şəklində, yəni **Babirakan xel** kimi yazıldığını qeyd etsə də,[34] özünün tərcüməsi

---

[27] Jost Gippert, Wolfgang Schulze, Zaza Aleksidze, Jean-Pierre Mahé, *The Caucasian Albanian Palimpsests of Mount Sinai. Monumenta Palaeographica Medii Aevi/Series Ibero-Caucasica 2 (MPMA-CAPMS)*, Vol. I, Turnhout, Brepols 2009, IV-40.
[28] Marie-Félicité Brosset, *Gürcistan Tarihi (Eski çağlardan 1212 yılına kadar)*, (çev. Hrand D.Andreasyan), Türk Tarih Kurumu Yayınları, Ankara 2003, s. 391.
[29] Kirakos Qandzaketsi, *İstoriya Armenii (per.* s. drevnearmyanskoqo, pred. i komm. L.A. Xanlaryan), Nauka, Moskva 1976, s.391.
[30] K. Qandzaketsi, *a.g.e.,* s. 163, 268.
[31] Allen David, *A History of the Georgian People: From the Beginning Down to the Russian Conquest in the Nineteenth Century,* Kegan Paul, Trench, Trübner & Co., Ltd., London 1932, s.104; Vladimir Minorsky, *Studies in Caucasian History*, Taylor's Foreign Press, London 1953, p.102.
[32] K. Qandzaketsi, *a.g.e.,* s. 281.
[33] V. Minorsky, *a.g.e*., s. 102.
[34] K. Qandzaketsi, *a.g.e.,* s. 281.

olan nəşrdə saxtakarlıq edərək "kürd" sözünü əlavə etmişdir.[35] Qeyd edək ki, bu qədim türk soyunun mənsub olduğu oymağın adı **Bay Börü xan Eli** kimi başa düşülməlidir. Maraqlıdır ki, Mxarqrdzeli nəslinin nümayəndələri arasında 3 Ağbuğa adlı şəxs də olub. Xaçın knyazı Həsən Cəlalın (1214-1261) həyat yoldaşı Mamqan, oğlu İvane-Atabəy, qızları Ruzuxan[36], Mama xatun və Mina xatun idi[37]. İosif Orbelinin Həsən Cəlal barədə verdiyi məlumat da maraqlıdır. O yazırdı: "1142-ci ildən Xaçın evinin başında Sakar Vaxtanqın oğlu Həsən dayanırdı. Bu Həsən 1152-ci ildə şanlı Baqratilər nəslinin Lori qolunun son nümayəndələrindən biri çar Kürikin (Gürgənin) qızı Mama xatunla evləndi.. o özünü hAterk, hAndaberd, Xaçenaberd və hAvkaxaqats qalalarının hakimi adlandırır. Bütün bu məlumatları 3 yazı təsdiq edir: ikisi 1182-ci ildə Dadi monastrında olan yazı və 1201-ci ildə Xatra monastrında olan yazı".[38] Alban-Xaçın knyazlığı Eldənizlər dövlətinə tabe olmaqla, həm qıpçaqlarla, həm də monqollarla qohumluq əlaqələri yaratmaqla bir müddət daxili müstəqilliyini qoruyub saxlaya bilmişdi. Qıpçaq qızı Hurişah Xatun və oğlu Həsən Cəlal tərəfindən Gəncəsər monastır kompleksinin inşa etdirilməsi və Azərbaycan ərazisində yerli xristian əhalinin vahid dini mərkəzinə çevirilməsi Alban etnosunu erməni və gürcü işğalçılarının hücumlarına qarşı qorudu, tamamilə məhv olmaqdan xilas etdi.

Orta əsrlər dövründə Alban apostol kilsəsinin mərkəzi olan Gəncəsər məbədinin tarixində ən ağır və faciəli dövr 1836-cı ildən sonra başlandı. Həmin ildə Rusiya Sinodunun qərarı ilə müsəqil Alban kilsəsi rəsmi olaraq ləğv edilərək diofizit mərkəzi statusunu itirmiş və erməni qriqoriyan kilsəsinin təsiri altına keçmişdir.[39] Gəncəsər monastr kompleksi 27 il Ermənistan silahlı qüvvələrinin işğalı altında olduğundan təhlükəli vəziyyətdədir. Abidənin tarixinin öyrənilməsi baxımından son dərəcə qiymətli

[35] K. Qandzaketsi, *a.g.e.*, s. 162.
[36] Dimitri Korobeinikov, *Byzantium and the Turks in the Thirteenth Century*, Oxford University Press, Oxford 2014, s. 174-175.
[37] Baqrat Ulubabyan, *Xaçın knyazlığı X-XVI əsrlərdə*, Ermənistan SSR EA nəşriyyatı, Erevan 1975, s. 219; Stepan Hasan-Jalalyan, "The origin and activities of the prince of princes, king of the XIII century of Artsakh Hasan-Jalal-Dola", Artsakh State University's, Proceedings, humanitarian science, Vol. 1, Stepanakert 2016, s. 177-186
[38] İosif Orbeli, *Hasan Calal, knyaz Xaçenskiy. [Mélanges asiatiques. Tirés du Bulletin de l'Académie Impériale des sciences de St.-Pétersbourg. Tome XIV (1909—1910,)* St.-Pétersbourg, 1910. C. 59-90] = BAIS VIme Série. III. 1909, s. 406.
[39] *Vısoçayşe utverjdennoe polojenie ob upravlenii delami Armyano-Qriqorianskoy Tserkvi v Rossii, 11 marta 1836 qoda.* Polnoe sobranie zakonov Rossiyskoy İmperii. Sobr. 2-e. T. 11. Otd. 1, SPb. 1837, № 8970, s. 194−209.

mənbə olan kitabələri sökülüb, xaç daşları sındırılaraq yerinə erməni xaç daşları yerləşdirilib, həm xarici, həm də daxili görünüşündə ciddi dəyişikliklər edilmişdir.

Yaxud da Azərbaycan Respublikasının Kəlbəcər rayonunun Vəng kəndi ərazisində yerləşən, bütövlükdə Azərbaycanın ən böyük kafedral statusu daşıyan Arzu xatun kilsəsini də özündə ehtiva edən Xudavəng monastr kompleksi də qıpçaq tarixinə şahidlik edən tarixi abidələrdən biridir. Bu abidə 1214-cü ildə Yuxarı Xaçın knyazı Vaxtanqın həyat yoldaşı Arzu xatun tərəfindən inşa olunmuşdur.[40] Tərtər çayının qərbində yerləşir. Xudavəng monastr kompleksinin Arzu xatun kilsəsinin kitabəsində belə qeyd olunur: *"Hər şeyə qadir Tanrı Ata və onun yeganə Oğlu İsa Məsihin rızası, ən Müqəddəs ruhun bəxşişi ilə mən, İsa Məsihin itaətkar qulluqçusu, knyazlar knyazı böyük Kurdun qızı, Aterk və bütün Yuxarı Xaçının hakimi çar Vaxtanqın həyat yoldaşı, böyük ümid ilə həyat yoldaşım və övladlarım - ilk övladım Həsən və körpə ikən bizi tərk edərək Tanrıya qovuşmuş Qriqorun məzarları üzərində bu kafedral kilsəni inşa etdirdim".*[41] Yaxud da Kəlbəcərin Qamışlı kəndi ərazisində aşkar edilən kilsə timpanı üzərindəki yazılı daş üzərində belə bir maraqlı yazı öz əksini tapıb: "Dualarda xatırla ki, mən, Vaxtanqın həyat yoldaşı Arzu xatun və mənim bacım Mama xatun bu kilsəni inşa etdi".[42] 1191-ci ildə alban tarixçisi Mxitar Qoşa Nor Getik monastrını inşa etməyə kömək edən[43] Arzu xatun Yuxarı Xaçın, Aterk (Həsənriz - Kəlbəcərdə kənd) knyazı Vaxtanqın (1182-1214) həyat yoldaşı idi.[44] Qarabağın qıpçaq tarixinə nəzər salarkən Qarabağın alban məlikləri ilə bağlı da maraqlı məqamlar ortaya çıxır. 1723-cü ilin martında Qarabağ məliklərinin I Pyotra etdikləri müraciət məktubunda alban türkü ifadəsi[45] öz əksini tapıb. Maraqlıdır ki, mənbənin ermənicəsində bu ifadə alban türkü, rus dilinə tərcüməsində müsəlman alban[46] kimi təqdim olunur. Yaxud da Dizaq məliyi Məlik Yeganın bacısı, Məlik Hüseyn I Məlik Şahnəzərin arvadı Anna xatun idi.[47] Yaxud da Talış məlikliyi ərazisinə Murov dağının dərəsində əsası 1651-ci ildə qoyulmuş Yerek Mankunk monastrının katalikosu İsraelin bacısı Vard xatun idi.[48]

---

[40] Raffi, *Melikstva Xamsı (1600-1827)* (per. s. arm. L.Kazaryana). Nairi, Yerevan 1991, s. 221.
[41] Şagen Mkrtçyan, *Istoriko-arxitekturnıye pamyatniki Naqornoqo Karabağa* [per. s. arm. L.R.Baqdasaryan, Q.L.Petrosyan, Parberakan, Yerevan 1989, s. 36.
[42]Barseqişen i yevo okrestnosti - https://hay.do.am/publ/31-1-0-272 (12.12.2020).
[43] Hraçe Açaryan, *Erməni şəxs adlarının lüğəti*, C. I, İrəvan dövlət Universiteti, İrəvan 1942, s. 274.
[44] K. Qandzaketsi, *a.g.e.*, s. 144.
[45] *AVPRİ, f. 100, 1723 g., d.1, l.2.*
[46] *AVPRİ, f. 100, 1723 g., d.1, ll. 10-11.*
[47] Raffi, *a.g.e.*, s. 37.
[48] Raffi, a.g.e., s. 68.

## Nəticə

Sadalanan faktları ümumiləşdirərək belə bir nəticəyə gəlmək olar ki, Qarabağın alban-qıpçaq tarixi dərin köklərə dayanır. Bu əlaqələr XII əsrdən etibarən Xaçın knyazlığının fonunda daha sıx xarakter almışdır. Xüsusilə də, Alban-Xaçın knyazlarının onlara soy-kök baxımından yaxın olan tanınmış Qıpçaq nəsillərindən qız almaları bu əlaqələri daha da möhkəmləndirmişdir. Maraqlıdır ki, xristian qıpçaq xatunlar Qarabağa gəlin gəldikdən sonra da türklüklərini simvolizə edən xatun titulunu qoruyub saxlamışdılar. Alban kilsələrinin kitabələrində günümüzə qədər gəlib çıxan Hurişah xatun, Mina xatun, Arzu xatun, Mama xatun, Vard xatun, Anna xatun kimi qadın adları da bunu təsdiq edir. Yaxud da alban tayfalarının soykökü ilə bağlı bir məqam mütləq diqqətə alınmalıdır. Belə ki, bugün Qazaxıstanda böyük juzun nəsillərindən biri albanlardır. Alma-Atadan şərqə doğru rayonları məskunlaşdırıblar. Qazaxıstanla yanaşı Qırğızıstanda da yaşayırlar. Albanların iki böyük qolu var: sarı və Şıbıl. Albanların sarı qolu polovetslərlə, yəni qıpçaqlarla bağlıdır.[49] Yaxud da tarixi mənbələrdə qorunub saxlanılan Otuzikilər tayfasının 8 qıpçaq oymağından xüsusilə ikisi, Əski və Yeni Kuman oymağının adı da birbaşa Qarabağda mövcud olmuş köklü qıpçaq tarixini iki müxtəlif mərhələsinə şahidlik edir. Bu istiqamətdə görüləcək işlər alban-qıpçaq tarixi ilə bağlı həm ziddiyyətli məqamlara aydınlıq gətirməyə, həm də erməni saxtalaşdırmalarına tutarlı cavab verməyə imkan verəcəkdir.

[49] Yuriy Yevstiqneyev, *Sovremennıe tyurki: etno-istoriçeskiy spravoçnik o tyurkoyazıçnıx narodax mira, NPF Asterion, SPb*. 2004, s. 12.

**İstifadə Edilmiş Ədəbiyyat**

"Lori", *Soviet Armenian Encyclopedia (in Armenian) Vol.* 4, Armenian Encyclopedia, Yerevan 1978, pp. 663 – 664.

AÇARYAN, H., *Erməni şəxs adlarının lüğəti*, C. I, İrəvan dövlət Universiteti, İrəvan 1942.

*Arxiv Vneşney Politiki Rossiyskoy İmperii (AVPRİ), f. 100, 1723 g., d.1, l.2*

*AVPRİ, f. 100, 1723 g., d.1, ll.10-11*.

Barsegişen i yego okrestnosti - https://hay.do.am/publ/31-1-0-272 (12.12.2020).

BROSSET, M.F., *Gürcistan Tarihi (Eski çağlardan 1212 yılına kadar)*, (çev. Hrand D.Andreasyan), Türk Tarih Kurumu Yayınları, Ankara 2003.

ÇİNGİZOĞLU, Ə., "Otuziki mahalı", *Soy elmi-kütləvi dərgi*, №9, Bakı, 2010, s. 44-49.

DAŞKEVİÇ Y., "Armyano-kıpçakskiy yazık: etapı istorii", *Voprosı yazıkoznaniya*, №1, Nauka, Moskva 1983, s.91-107.

DAVID, A.W.E., *A History of the Georgian People: From the Beginning Down to the Russian Conquest in the Nineteenth Century*, Kegan Paul, Trench, Trübner & Co., Ltd., London 1932.

ƏLİYEV, İ. və MƏMMƏDZADƏ, K., *Qarabağın Alban abidələri*, Azərbaycan Dövlət nəşriyyatı, Bakı 1997.

*Gəncə-Qarabağ əyalətinin icmal dəftəri. [Tapu təhrir dəftəri - 699],* (Ön sözün müəl. Y.M.Mahmudov; tərt. T.H.Nəcəfli), Çaşıoğlu, Bakı 2010.

GİPPERT, J., SCHULZE, W., ALEKSİDZE, Z. and MAHE, J.-P., *The Caucasian Albanian Palimpsests of Mount Sinai. Monumenta Palaeographica Medii Aevi/Series Ibero-Caucasica 2 (MPMA-CAPMS).* 2 vols., Turnhout, Brepols 2009 .

HASAN-JALALYAN, S., "The origin and activities of the prince of princes, king of the XIII century of Artsakh Hasan-Jalal-Dola", *Artsakh State University's, Proceeding*s, humanitarian science, Vol. 1, Stepanakert 2016, p. 177-186.

ISTVAN. V., *Cumans and Tatars: Oriental Military in the Pre-Ottoman Balkans, 1185–1365,* Cambridge University Press, Cambridge 2005.

KIRZIOĞLU, F., *Osmanlıların Kafkas ellerini fethi (1451-1590)*, Türk Tarih Kurumu Yayınları, Ankara 1998.

KIRZIOĞLU, F., *Yukarı-Kür ve Çoruk boyları'nda Kıpçaklar: ilk-Kıpçaklar (M.Ö. VIII-M.S. VI. yy.) ve son-Kıpçaklar (1118, 1195) ile Ortodoks-Kıpçak atabekler hükûmeti (1267-1578) Ahıska Çıldır eyâleti tarihi'nden*, Türk Tarih Kurumu Yayınları, Ankara 1992.

KOROBEİNİKOV, D., *Byzantium and the Turks in the Thirteenth Century*, Oxford University Press, Oxford 2014.

QANDZAKETSİ, K., *İstoriya Armenii (per.* s. drevnearmyanskoqo, pred. i komm. L.A. Xanlaryan, Nauka, Moskva 1976.

QARKAVETS A., *Konvergentsiya armyano-kıpçakskoqo yazıka k slavyanskim v XVI-XVII vv*., Naukova dumka, Kiyev, 1979.

MAHMUDOV, Y.M., “"Dədə Qorqud kitabı" - xalqın yaratdığı və yaşatdığı tarix*”,* Dədə Qorqud dünyası: məqalələr, Öndər nəşriyyat, Bakı 2004, s. 18-35.

MAHMUDOV, Y.M., ŞÜKÜROV, K.K., *Qarabağ: Real tarix, faktlar, sənədlər,* Təhsil, Bakı 2013.

MİNORSKY, V.F., *Studies in Caucasian History*, Taylor’s Foreign Press, London 1953.

MKRTÇYAN, Ş. M., *Istoriko-arxitekturnıye pamyatniki Naqornoqo Karabağa* [per. s. arm. L.R.Baqdasaryan, Q.L.Petrosyan, Parberakan, Yerevan 1989.

ORBELİ, İ.A., *Hasan Calal, knyaz Xaçenskiy. [Mélanges asiatiques. Tirés du Bulletin de l’Académie Impériale des sciences de St.-Pétersbourg. Tome XIV (1909—1910,)* St.-Pétersbourg, 1910. C. 59-90] = BAIS VIme Série. III. 1909, s. 405-436.

PSEVDO-ZAXARİYA, “Xronika Zaxariyii Ritora (Mitilenskovo)” (per. N. Piqulevskoy) Siriyskiye istoçniki po istoriyii narodov SSSR. M.; L. 1941, s.148-167.

RAFFİ, *Melikstva Xamsı (1600-1827)* (per. s. arm. L.Kazaryana). Nairi, Yerevan 1991.

SÜMER, F. *Safevi devletinin kuruluşu ve gelişmesinde Anadolu türklerinin rolü*, Güven Matbaası, Ankara 1976.

TEHRANİ. Ə., *Kitabi–Diyarbəkriyyə,* (fars dilindən tərcümə edən, ön söz və şərhlərin müəllifi R.Şükürova), Elm nəşriyyatı, Bakı 1998.

ULUBABYAN, B.A., *Xaçın knyazlığı X-XVI əsrlərdə,* Ermənistan SSR EA nəşriyyatı, Erevan 1975.

URSIN, G.H., *Dionysius Periegetes. Οικουμένης περιήγησης – Dionysii Orbis Terrae Descriptio,* Typis Joh. Georgii Hofmanni, Ratispon 1705.

*Vısoçayşe utverjdennoye polojeniye ob upravlenii delami Armyano-Qriqorianskoy Tserkvi v Rossii, 11 marta 1836 qoda.* Polnoe sobraniye zakonov Rossiyskoy İmperii. Sobr. 2-e. T. 11. Otd. 1, SPb. 1837, № 8970, s. 194−209.

YEPİSKOP MAKAR (Q. Barxudaryants), *Artsax*, Aror, Baku 1885.

YEVSTİQNEYEV, Y.A., *Sovremennıye tyurki: etno-istoriçeskiy spravoçnik o tyurkoyazıçnıx narodax mira, NPF Asterion, SPb*. 2004.